AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI

# TARİX İNSTİTUTU



# ELMİ ƏSƏRLƏR

2010, cild 32

# SCIENTIFIC WORKS

**OF THE INSTITUTE OF HISTORY NAS OF AZERBAIJAN**

2010, volume 32

# ТРУДЫ

**ИНСТИТУТА ИСТОРИИ НАН АЗЕРБАЙДЖАНА**

2010, том 32






**1947-ci ildən nəşr olunur**

**32/2010**



# ŞƏKİ XANLIĞININ OSMANLI İMPERİYASI İLƏ ƏLAQƏLƏRİ TARİXİNDƏN

**Günay Talıbova**[1]

Azərbaycan tarixşünaslığında xanlıqlar dövrünə bir sıra qiymətli əsərlər [9; 7; 13; 19] həsr olunsa da Şəki xanlığının, habelə digər Azərbaycan xanlıqlarının Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələri indiyədək öyrənilməmiş qalır. Sovet dövründə bu istiqamətdə tədqiqatların aparılmaması bir tərəfdən Azərbaycan – Osmanlı münasibətlərinin araşdırılması üzərinə qoyulan yasaqla, digər tərəfdən Osmanlı – türk mənbələrinin Azərbaycan alimləri üçün əlçatmaz olması ilə əlaqədar idi. Bununla yanaşı, Rusiya işğalları dövründə Cənubi Qafqazın tarixi məsələlərinin geniş əks olunduğu çox qiymətli ilk mənbə olan "Акты Кавказской Археографической Комиссии"nin cildlərində Rusiya imperiyasının Cənubi Qafqazda apardığı işğalçılıq müharibələri dövründə Azərbaycan xanlıqları və sultanlıqlarının tarixinə dair, o cümlədən Şəki xanlığının tarixi barədə olduqca qiymətli məlumatlar vardır. Lakin çox təəssüf ki, bu qiymətli mənbədə Şəki xanlığının Osmanlı imperiyası ilə əlaqələrinə dair məlumatlar yox dərəcəsindədir. Əlbəttə, bunun özü də Azərbaycan xanlıqlar dövrü tarixinin dərindən öyrənilməsinə müəyyən qədər mənfi təsir göstərməmiş deyil. Odur ki, tarixşünaslığımızdakı bu boşluğu aradan qaldırmaq üçün tədqiqatçılarımızın indiyədək lazımınca faydalanmadıqları osmanlı mənbələrinin, xüsusilə də Türkiyə Cümhuriyyəti Başbakanlıq Osmanlı arxivində saxlanılan sənədlərin çox mühüm əhəmiyyəti var. Şəki xanlığının Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələrinə həsr olunmuş bu məqalə də, əsasən, məhz həmin mənbələr əsasında yazılmışdır.

Şəki Azərbaycanın şimal – qərb bölgəsində Azərbaycan dövlətçiliyinin qorunub saxlanmasında və müxtəlif tarixi dövrlərdə ölkəyə təcavüz edən yadelli işğalçılara qarşı mübarizədə mühüm rol oynamışdır. Şimal – Qərbi Azərbaycan, o cümlədən Şəki bölgəsi, ən qədim zamanlardan, xüsusilə tariximizin kimmer – iskit (skif) – sak dövründən başlayaraq müxtəlif türk toplumlarının kütləvi şəkildə məskən saldığı diyarlardandır. Yurdun məhz bu bölgəsi Azərbaycan xalqının qəhrəmanlıq eposu olan "Kitabi – Dədə Qorqud" dastanları ilə bilavasitə bağlıdır. "Kitabi–Dədə Qorqud" dastanlarının "Bəkil oğlu İmran" boyunda cərəyan edən hadisələr Azərbaycanın məhz bu regionlarında baş vermişdir [11, s. 16 – 17].

Ərəb xilafətinin süqutu nəticəsində Azərbaycan ərazisində meydana gələn yerli dövlətlərdən biri də Şəki hakimliyi idi. Şəki hakimləri orta əsrlərdə Azərbaycanın şimal – qərb torpaqlarının yadelli işğallarından qorunmasında fəal iştirak etdikləri kimi, Azərbaycanın daxilində gedən siyasi proseslərdə mühüm rol oynamışlar. Azərbaycanın şimal – qərb torpaqlarını yadelli hücumlarından qoruyan Şəki hakimləri eyni zamanda Azərbaycan Albaniya dövlətinin varisləri kimi çıxış edirdilər [ 20, s. 116 - 137]. Ayrı – ayrı dövrlərdə Albaniya hökmdarı titulunu qəbul edən Şəki hakimləri əslində uzun tarixi

---

[1] Günay Xaliq qızı Talıbova – AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun kiçik elmi işçisi

dövr ərzində hökmranlıq etdikləri ərazidə Azərbaycan – Albaniya mədəniyyətinin inkişafını davam etdirmişlər.

Şəki hakimliyinin ərazisi eyni zamanda Xilafətin süqutundan sonra uzun müddət islamla xristianlıq arasında mürəkkəb mübarizə meydanı olmuşdur. Bu mübarizənin gedişində üstünlük təşkil edən türk toplumları, o cümlədən oğuz – türk tayfaları regionun etnik – siyasi tarixində mühüm rol oynamış, buralarda islam dininin geniş yayılmasını və üstünlük qazanmasını təmin etmişlər.

Bütün orta əsrlər boyu Azərbaycanın şimal – qərb regionunda hegemonluğu əldə saxlayan Şəki hakimliyi Səfəvilər dövlətinin tənəzzülü dövründə yenidən müstəqilləşməyə başlamış, Nadir şah Əfşarın imperiyası dövründə isə Şəki Azərbaycanın şimal – qərb bölgəsində müstəqillik mübarizəsinin mərkəzinə çevrilmişdi. Bu mübarizənin gedişində yerli müsəlman – türk əhaliyə başçılıq edən Hacı Çələbi mərkəzi hakimiyyət tərəfindən müdafiə olunan Məlik Nəcəfi məğlub edərək, hələ Nadir şahın sağlığında ikən Şəkini Azərbaycan ərazisində ilk müstəqil xanlığa çevirmişdi. Nadir şahın yeni yaranmış müstəqil Şəki xanlığının başçısını aradan götürmək planı iflasa uğramışdı [ 19, s. 16 – 17; s. 26 - 27]. İmperiya daxilində yaranmış ilk müstəqil Azərbaycan dövlətini aradan qaldırmaq siyasəti və bu məqsədlə Nadir şahın həmin bölgəyə təşkil etdiyi yürüşlər heç bir nəticə verməmişdi.

Nadir şahın öldürülməsindən (1747) sonra isə Azərbaycanda çoxsaylı xanlıqlar və sultanlıqlar meydana gəldi. Beləliklə, Azərbaycan tarixində ölkədə hegemonluq uğrunda ayrı – ayrı xanlıqlar və sultanlıqlar arasında uzun sürən ara çəkişmələri dövrü başlandı ki, bu da Azərbaycanın tarixi müqəddəratı üçün fəlakətli sonluqla nəticələndi.

Yeri gəlmişkən, bəzi uzaqgörən Azərbaycan xanları Rusiya imperiyası və qacarlar İranı tərəfindən ölkə üçün artmaqda olan işğal təhlükəsinin yaxınlaşdığı şəraitdə xarici təcavüzə müqavimət göstərmək üçün Azərbaycanı vahid mərkəzləşdirilmiş dövlət halında birləşdirməyə cəhd göstərdilər. Bunlardan biri də Hacı Çələbi xanın başçılıq etdiyi Şəki xanlığı idi.

Görkəmli dövlət xadimi Hacı Çələbi xanın hakimiyyəti dövründə (1743–1755) Şəki xanlığı bir tərəfdən qərbdən Rusiyanın müdafiə etdiyi gürcü çarlarının işğallarına qarşı mübarizə aparır, digər tərəfdən yaxınlaşmaqda olan Rusiya – İran təcavüzü əleyhinə Azərbaycanı birləşdirmək siyasəti yeridirdi. Bu məqsədlə o, ilk növbədə Osmanlı imperiyası ilə əlaqələr yaratmışdı [ 15, s. 32 - 35].

Qeyd etmək lazımdır ki, bəhs etdiyimiz dövrdə Rusiya ilə hərbi qarşıdurmaya meyl göstərməyən Osmanlı imperiyası Rusiyanın Azərbaycan xanlıqları ilə münasibətlərini və özünün bölgədəki mənafeyini diplomatik yolla tənzimləməyə çalışırdı. Belə ki, Osmanlı sultanlarının tapşırığı ilə Azərbaycanla həmsərhəd olan əyalətlərin valiləri Azərbaycan xanlıqlarında baş verən hadisələri diqqətlə izləyir və topladıqları məlumatları mərkəzə ötürürdülər [ 12, s. 44; 29, s. 27]. Beləliklə, Osmanlı dövləti xanlıqlara və sultanlıqlara parçalanmış Azərbaycanda baş verən hadisələrlə yaxından tanış idi.

Azərbaycan xanlarının Osmanlı sarayına ünvanladıqları çoxsaylı məktublar bəhs olunan dövrdə Azərbaycanla Osmanlı imperiyası arasında geniş əlaqələr olduğunu sübut





edir.* Məsələn, 1746 - cı ildə (hicri 1158 – ci il) Əhməd xanın möhürü ilə Osmanlı vəzirinə göndərilmiş məktubda Şəkidə Hacı Çələbinin hakimiyyəti ələ keçirməsindən, Nadir şahın onun üzərinə təşkil etdiyi yürüşlərdən və onların nəticələrindən, Hacı Çələbinin kömək üçün Osmanlı sarayına məktub göndərməsindən bəhs olunur. Məktubda göstərilir ki: *"... Şirvan əyalətinin Şəki kəndlərində hakimiyyəti ələ almış Hacı Çələbi adı ilə məşhur olan bir şəxs Nadirə qarşı yerli kəndxudalarla ittifaq bağladı. Nadir şah Şirvana təcavüz etdiyi zaman Hacı Nadirə üstün gəlib onu məğlub etmişdir. ... Hacı Çələbi üç dəfə Nadirin qoşunları ilə müharibə edib və Haqq Təala həzrətlərinin inayətilə qələbə çalmışdır. ...bu gün harada olduğu bilinməyən Nadir şahın təkrar edəcəyi bir hücum müqabilində bu tərəflərdə olan bütün əsgərlərini götürüb islam əsgərinə qoşmaq niyyətində olan Hacı Çələbinin məktubunu Sizə göndərmişik. Nadirin vəziyyəti barədə məlumat almaq üçün göndərilən casuslar hələ geri dönməyib. Bundan sonra da bu ətraflarda hər hansı bir hadisə baş verərsə tez bir zamanda rəsmi sənədlə sizə xəbər verərik..."* [ 14, s. 478 – 475]. Göründüyü kimi, bu məktub Şəki xanlığı ilə Osmanlı dövləti arasındakı qarşılıqlı əlaqələrin başlanma tarixinin dəqiqləşdirilməsi və bəhs olunan dövrdə baş vermiş siyasi hadisələrin gedişinin öyrənilməsi üçün olduqca əhəmiyyətli ilk mənbədir.

Şəki xanlığı ilə Osmanlı imperiyası arasındakı münasibətlərin araşdırılmasında olduqca əhəmiyyətli olan digər bir sənəd 1754 – cü ildə Hacı Çələbi xanın şəxsən özünün Osmanlı sarayına göndərdiyi məktubudur. Hacı Çələbi xan göstərilən məktubunda yazırdı: *"...Nadir şah saysız – hesabsız əsgərləri ilə Şirvan və Dağıstan mahalını işğal etməklə böyük dağıntılar törətmişdir. Buraya da ardı – arası kəsilməyən yürüşlər etmiş, doqquz ay mühasirədə saxlamışdı. Lakin Allah bizə kömək oldu. ....Nadir şahın ölümündən sonra İranın müxtəlif yerlərində xanlıqlar müstəqil fəaliyyət göstərməyə başladı. .... Osmanlı dövləti hələ qədimdən bəri, ehtiyac olduqda, Dağıstan, Şirvan və onun ətrafındakı xanlara hər zaman kömək etmişdir..."* [ 17, s. 452 - 451].

Hacı Çələbi xan yuxarıda göstərilən məktubunda, həmçinin, gürcü çarlarının Car–Balakən camaatlıqları üzərinə yürüşlərindən, Şəki xanlığının bu yürüşlər zamanı yadellilərə qarşı baş vermiş döyüşlərdə iştirakından, döyüşlərin gedişi və nəticələrindən də ətraflı bəhs edir, gürcü çarlarının bu yürüşlərdə Rusiya ilə əlbir olduğunu vurğulayırdı: *"... gürcü valiləri haqlı – haqsız varislik iddiasında olub, kafir ruslarla əlbir olaraq, 40 – 50 min əsgərlə Car – Tala camaatı üzərinə hücum etmişlər. ...Car və Tala camaatı ilə bizim mehriban qonşuluğumuz, həm də din və məzhəb eyniliyimiz var. Buna görə də biz onların imdadına getdik. .... Vuruşma bir saat yarım çəkdi. Allahın köməyi ilə müsəlmanlar qələbə çaldı, kafirlər məğlub oldu "* [ 17, s. 452 - 451].

Məlum olduğu kimi, Şəki xanlığı ilə qonşu Car – Balakən camaatlıqları arasında mehriban qonşuluq və sıx dostluq münasibətləri vardı [1]. Belə ki, hələ 1744 – cü ildə Şəki xanlığının yaranmasından çox keçməmiş, Nadir şah öz qoşunu ilə Şəki xanlığına

* Geniş məlumat üçün bax: Osmanlı belgelerinde Karabağ. İstanbul, 2009; Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010.

yürüş etdi. Hacı Çələbi xanın müdafiə olunmaq üçün sığındığı Gələsən–Görəsən qalası mühasirə olundu. Lakin mühasirədə olan Hacı Çələbinin qoşunu gecələr qaladan çıxıb şah ordusuna hücumlar edir, ona ağır tələfatlar verirdi. Məhz bu ağır sınaqlar dövründə Car – Balakən döyüşçüləri şəkililərin köməyinə gəlir, həmin çətin mübarizədə onlara köməklik edirdilər. Bu birgə mübarizə Nadir qoşunlarının ciddi tələfatına səbəb olmuş və onlar geri çəkilməyə məcbur olmuşdular [19, s. 21].

Hacı Çələbi xanın haqqında bəhs etdiyimiz məktubunun bütövlükdə Azərbaycan tarixinin, o cümlədən Şəki xanlığının tarixinin öyrənilməsində digər bir mühüm əhəmiyyəti də ondan ibarətdir ki, həmin məktubda 1752 – ci ildə baş vermiş Qızılqaya xəyanəti də öz geniş əksini tapmışdır. Belə ki, 1752 – ci ildə gürcü çarları Teymuraz və II İrakli Gəncəyə yürüş etməyi qərara aldılar. Lakin onlar bilirdilər ki, Şəki və Qarabağ xanları da Gəncəni ələ keçirməyə çalışırlar. Buna görə də II İrakli hiylə işlədərək vaxtı ilə Qarabağa hücum etdiyi üçün Hacı Çələbi xandan narazı qalmış Qarabağ xanı Pənah xanı (1748 - 1763) öz tərəfinə çəkmək üçün onunla danışıqlara girdi və getdikcə güclənməkdə olan Şəki xanına qarşı ittifaq bağlamağı təklif etdi. Həmin təkliflə razılaşan Pənah xanla yanaşı bu ittifaqa Gəncə xanı Şahverdi xan (1747 – 1760), Qaradağ xanı Kazım xan (1747 – 1752), İrəvan xanı Hüseynəli xan və Naxçıvan xanı Heydərqulu xan (1747 – 1763/64) da qoşuldular. Xanlar II İrakli ilə görüşüb Hacı Çələbi xana qarşı danışıqlar aparmaq üçün Gəncəyə gələrkən, II İraklinin pusquda durmuş qoşun hissələri qəflətən hücum edərək onları əsir aldı və qollarını qandallayıb Gürcüstana doğru hərəkətə başladı. II İrakli bu yolla Azərbaycan xanlıqlarını özündən asılı hala salmaq istəyirdi. Bundan xəbər tutan Hacı Çələbi xan Azərbaycan xanlarını xilas etmək üçün II İraklinin hərbi qüvvələrini təqib edərək darmadağın etdi. II İrakli tərəfindən xəyanət yolu ilə əsir alınmış Azərbaycan xanları isə azad olundular [4, s. 186; 19, s. 30; 7, s. 150 – 151; 23, s. 123]. Bu hadisə Hacı Çələbi xanın Osmanlı sarayına yazdığı məktubunda belə əks olunmuşdur: "... *Qaradağlı Kazım xan, Pənah xan Cavanşir, Haqverdi xan, Hüseynəli xan, Nəcəfqulu xan.... və sairə xanlar birləşib. ... (II İrakli – T.G.) xanların hamısını öz çadırına topladı. Ziyafət əsnasında onları həbs etdi. Sonra Gəncə qalası üzərinə hərəkət etdi. ...səhərdən günortanın sonlarına qədər ox-oxa, top-topa, misli görünməmiş döyüş oldu. Allahın köməyi ilə müsəlmanlar qələbə çaldı* " [17, s. 452 - 451].

Məktubun sonunda Hacı Çələbi xan Osmanlı dövləti ilə olan münasibətlərindən bəhs edərkən sultana bir il öncə də məktub göndərdiyini vurğulayır. "... *bu hadisəni bilməniz və bundan şad olmanız üçün baş vermiş bu hadisəni şəxsinizə bildirdim. Osmanlı dövləti daima İslam dini uğrunda çoxlu işlər görüb. Keçən il də mən sizə məktub göndərmişdim. İndi də sizə şahənə hədiyyələr göndərirəm və sizə dərin təşəkkürümü bildirirəm...* ". Şəki xanının məktubunun sonunda qeyd olunmuş bu fakt sübut edir ki, həmin məktub Hacı Çələbi xanın Osmanlı dövlətinə göndərdiyi ilk məktubu deyil.

Yeri gəlmişkən, qeyd etmək lazımdır ki, bəzi əsərlərdə bu məktubun düzgün olmayaraq 1747 – ci ildə (hicri 1160 – cı ilə) yazıldığı qeyd edilir. Lakin məktubdakı hadisələrin araşdırılması, müqayisəli təhlili, həmçinin Qızılqaya xəyanətinin 1752 – ci ildə baş verməsi faktı göstərilən məktubun 1753 – 1754 cü illərdə yazıldığını sübut edir.





Şəki xanlığı ilə Osmanlı imperiyası arasında əlaqələr Hacı Çələbi xanın hakimiyyətindən sonra da davam etmişdi. 1755 – ci ildə Hacı Çələbi xanın vəfatından sonra hakimiyyətə gəlmiş Şəki xanları əsas diqqətlərini xanlığın siyasi qüdrətinin daha da möhkəmləndirilməsinə, ərazisinin genişləndirilməsinə, qonşu xanlıqlarla münasibətlərin nizama salınmasına yönəltmişlər. Bununla belə, qonşu ölkələrlə, xüsusilə Osmanlı imperiyası ilə əlaqələr də davam etdirilmişdir.

XVII əsrin 80 – ci illərindən başlayaraq Şəki xanlığının Osmanlı imperiyası ilə münasibətlərində yenidən canlanma baş verdi. Bu Cənubi Qafqaz üçün Çar Rusiyasının işğal təhlükəsinin daha da artması ilə bağlı idi. Məsələ burasında idi ki, 1783 – cü ildə gürcü çarı II İrakli Rusiya ilə Georgiyevsk traktatını imzaladı [10, s. 265 – 276] Gürcüstan Rusiyanın himayəsini qəbul etdi. Gürcü çarının həmin müqaviləni imzalamaqda əsas məqsədi Çar Rusiyasının köməyi ilə Azərbaycan ərazisinə olan iddialarını həyata keçirmək idi. Bu məqsədilə o, dəfələrlə İrəvan, Gəncə xanlıqları, Car – Balakən camaatlıqları üzərinə yürüşlər etmişdi [1, s. 106 – 107; 29, s. 27 – 28]. Bu Azərbaycan xanlarını, xüsusilə də Şəki xanlarını ciddi narahat edirdi. Bu məqsədilə onlar Osmanlı sarayı ilə münasibətlərini davam etdirir, Cənubi Qafqazda baş verən hadisələr haqqında qarşı tərəfi məlumatlandırır, öz müstəqilliklərini qorumaq üçün Osmanlı dövlətindən kömək istəyirdilər.

Bəhs olunan dövrdə Şəki xanlığı ilə Osmanlı imperiyası arasında əlaqələrin davam etdiyini 1784 – cü ildə (hicri 1198 – cu il) Çıldır valisinə yazılan məktub bir daha sübut edir. Həmin məktubda deyilirdi: " *Mərhum və bağışlanılmış Sarı Mustafa paşanın qalası (Gəncə qalası – T. G.) doqquz aydır ki, Rusiya kafirlərinə tabe olan İrakli xan tərəfindən Rusiya əsgərləri ilə birlikdə top və topxana ilə mühasirə edilmiş, ətrafdakı kəndlər qarət edilmişdir. ... mərhəmətli Məhəmməd Həsən xanın, osmanlı qüvvələri və ləzgi tayfasının birləşməsi nəticəsində onların hücumu dəf olunmuşdur. ... Rusiyanın İran tərəfinə keçməsi üçün iki qapı var və ikisi də bağlıdır. Bunlardan biri Dərbənd tərəfdəndir ki, o güclüdür və o biri qapı bu tərəfdəndir ki, indi bu tərəfi zəif görüb istərlər ki, fürsət tapıb İslamiyyəni aradan götürələr"* [5, s. 370 – 369; 27, s. 92 - 93]. Bu məktubda, həmçinin lazım gəldikdə Şəki, Qarabağ və Şirvan xanlarının düşmənə qarşı birləşməsinin zəruriliyi vurğulanır, Osmanlı imperiyasının da onlara yardım etməsindən bəhs olunur: "... *Şəki xanı, Şirvan və Qarabağ sərkərdələri, Məhəmməd Səid xan, İbrahim xan, Ağası xan sözlərini bir ediblər ki, əgər müsəlman tərəfinə kafirlərdən hücum olarsa və hadisə üz verərsə, onlara qarşı birləşib mübarizə aparsınlar. Sizdən istədikləri də budur ki, belə vəziyyətdə sizlər də bu tərəfdən islama kömək edəsiniz...* " [5, s. 370 – 369; 27, s. 92 - 93].

Şəki – Osmanlı əlaqələri Məhəmməd Həsən xanın dövründə də davam etdirilmiş, iki dövlət arasında diplomatik münasibətlər mövcud olmuşdur. Məhəmməd Həsən xan qarşı tərəfə ünvanladığı məktublarının birində Çıldır valisinin elçisi vasitəsi ilə ona göndərilmiş məktubu aldığını xəbər verir, Çıldır valisinin gürcü çarı Teymuraz haqqında məlumat verilməsi barədə xahişini yerinə yetirdiyini, Teymurazın Moskvaya gedib orada öldüyünü, həmçinin Rusiya imperatorunun da vəfat etdiyini bildirirdi [13, s. 158].

Məhəmməd Həsən xan 1784 – cü ildə (hicri 1198 – ci il) Osmanlı sarayına göndərdiyi növbəti məktubunda isə yazırdı *“...İrakli xanın Rusiyanın təşviqi ilə Azərbaycan mülklərinə, o cümlədən İrəvan qalasına təcavüzünə qarşı Azərbaycan və Dağıstan xanlarının birlikdə hərəkət etmələri barədə əmrinizə riayət etməklə Dövləti Aliyyənin xidmətində olduq. ... Gəncə qalası bir neçə ildən bəri Rusiyanın yardımı ilə İrakli xanın işğalında ikən əhali, ətraf hakimlərin və Osmanlı ordusunun gücü ilə o geri alınmışdır. Sonradan İrakli xanın oğlu Almas Mirzə, yeznəsi (kürəkəni) Davud bəy və Şəmsəddinli Əli Sultan xeyli əsgərlə buraya hücum etmişlər. Qala əhalisinin xahişi ilə biz də Allahu Təalanın yardımı, əhali və digər ümməti Məhəmmədin köməyi nəticəsində düşmənin təcavüzünü dəf etmişik”* [ 18, s. 334 – 333; 27, s. 88 – 91; 28, s. 62 - 65]. Bu qiymətli məlumatdan aydın olduğu kimi, II İrakli Georgiyevsk traktatından dərhal sonra Rusiyanın köməyi ilə Azərbaycan torpaqlarını işğal etməyə və Gürcüstan ərazilərini genişləndirməyə çalışırdı.

Şəki xanı məktubunun sonunda İrandakı vəziyyətdən bəhs edərək yazırdı: *“... İran indi sahibsiz qalıb və hər kəs bir məmləkət zəbt etməklə məşğuldur. Onların təkbaşına Rusiyaya müqavimət göstərə bilməyəcəkləri məlumdur. Hamımız mərhəmətli və şəfqətli padşaha möhtacıq. Tiflis xanlığına ruslar tərəfindən cəbbəxana və sursat göndərilməsinə mane olmaq üçün bölgənin vəziyyətini bilən və etibarlı adamlardan olan Əli Əfəndi məlumat verməк üçün yanınıza göndərilir”* [ 18, s. 334 – 333; 27, s. 88 – 91; 28, s. 62 - 65]. Məhəmməd Həsən xanın bu məktubu onun öz dövrünün görkəmli dövlət xadimi olduğunu və Azərbaycanı düşdüyü fəlakətli vəziyyətdən qurtarmaq üçün yollar axtardığını sübut edir.

Gəncə qalasının Rusiyandan yardım alan II İrakli tərəfindən mühasirəyə alınması, Məhəmməd Həsən xan, eləcə də İrəvan xanlığının gəncəlilərin köməyinə gəlməsi sayəsində işğalçıların geri çəkilməyə məcbur olması faktı Çıldır valisi Süleyman paşanın 1785 – ci il iyunun 13 – də (hicri 1199 –cu il) Osmanlı sarayına göndərdiyi məktubunda da öz əksini tapmışdır. Bu məktubda diqqət çəkən digər bir fakt isə gürcü çarı II İraklinin Rusiya ilə 1783 – cü ildə bağladığı Georgiyevsk traktatının Azərbaycan xanlarına göndərilməsidir. Məktubda qeyd olunur ki: *“ Tiflis xanı İrakli xanın ruslarla bağlılığını ortaya qoyan və on üç maddədən ibarət olan anlaşma mətni Osmanlı dövlətinə meyl etməmələri təşviq etmələri üçün Azərbaycan və Dağıstan xanlarına göndərildi... ”* [6, s. 286 – 284; 27, s. 130 - 132].

Bəhs olunan məktubda, həmçinin, Osmanlı sarayından xanlar üçün göndərilən fərmanların, hədiyyələrin sahiblərinə çatdırılması və xanların da buna cavab olaraq öz adamlarını İstanbula göndərmələri haqqında da məlumat verilir: *“... Azərbaycan və Dağıstan xanlarına çatdırılmaq üzrə göndərilən ali fərmanlar və sultanın hədiyyə və ehsanları xəzinə katibimiz vasitəsilə yerlərinə çatdırıldı. ... Dövləti Aliyyədə tam sədaqətlə, səmimi məhəbbətlə... himayə olunmaları üçün Quba və Dərbənd hakimi Fətəli xan etibarlı adamı Hacı Əhməd bəyi, Şəki və Şirvan hakimi Hacı Çələbi xan oğlu Məhəmməd Həsən xan üləmasından Əli Əfəndi, Dağıstan əmirlərindən Avar hakimi Ümmə xan (Ömər xan – T.G.) etibarlı adamlarından əl-Haski və Şuşa və Qarabağ xanı İbrahim xan Mirzə Məhəmməd adlı etibarlı adamını xəzinə katibimizə qoşaraq göndərmişlər... ”* [6, s. 286 – 284; 27, s. 130 - 132].





Şəki xanlığı ilə Osmanlı imperiyası arasında qarşılıqlı əlaqələr xanlığın Rusiya tərəfindən işğalından sonra da davam etmişdir. Belə ki, Qarabağ xanı İbrahimxəlil xanın (1763 – 1806) təkidi ilə Şəki xanı Səlim xanın Rusiyanın himayəsini qəbul etməsinə baxmayaraq Çar Rusiyası, çox keçmədən hər iki xanla bağladığı müqavilələrin şərtlərini pozdu [21, s. 702- 705; 24, s. 705 – 707; 22; 10, s. 365 - 376]. 1806 - cı ildə Qarabağ xanı İbrahim xan ailəsi ilə birlikdə* işğalçılar tərəfindən qətlə yetirildi [ 26, s. 332]. Bundan narazı qalan və Şəki xanlığının da bu cür aqibətlə qarşılaşacağını yəqin edən Səlim xan işğalçılara qarşı fəal mübarizəyə başladı. Xanlığın ərazisi Çar Rusiyası tərəfindən zəbt olundu. İmperiyanın əlaltısı olan Xoylu Cəfərqulu xan Şəkiyə xan təyin olundu [25, s. 272 – 273; 29, s. 32]. Şəki xanı bundan sonra Vətənindən didərgin düşərək uzun müddət Qacarlar dövlətinin və Osmanlı imperiyasının köməyi ilə hakimiyyətini bərpa etməyə cəhd göstərdi. Bu baxımdan Şəki xanlığının Osmanlı imperiyası ilə əlaqələrini araşdırmaq üçün Türkiyə Cümhuriyyəti Başbakanlıq Osmanlı Arxivində qorunub saxlanılan “Hatt-i Hümayun” da mövcud bəzi məktublar olduqca maraqlıdır. Məsələn, 1818 –ci ilə (hicri 1234 – ci ilə) aid olan və Bağdad valisi Davud paşa tərəfindən Osmanlı sarayına göndərilmiş bir məktubda Şəki və Şirvan hakimi Səlim xanın 1813 – cü ildə ölkəsinin ruslar tərəfindən işğalından sonra İran şahzadəsi Abbas Mirzənin yanına gəlib burada yerləşməsi, bundan sonra tabeçiliyində olan yüz nəfərlə Bağdada səfər etməsi, burada Osmanlı valisi Davud paşa ilə görüşməsi və əgər Osmanlı imperiyasından yardım olarsa Şəki xanlığında hakimiyyətini bərpa etmək iqtidarında olması barədə məlumat verilir. Məktubda qeyd olunur: *“... Şəki və Şirvan hakimi, nəcabətli Səlim xan Bağdada gəlib qullarınızla görüşdü. ...ertəsi günkü yığıncağın müzakirəsi zamanı sual – cavab etməklə bu görüşün məqsəd və məramları haqqında xəbər aldıq. ... Şəki, Şirvan və Dağıstanda başdan – ayağa dağlıq ərazilərə yayılan əsgərləri öz tərəfinə cəlb edərək, az bir müddətdə bu qüvvələrin köməyi ilə həm xanlığı, həm də göstərilən əyalətləri xarici və daxili işğaldan qurtarmaq və öz hakimiyyəti altına almaq, həm də vaxt qazanaraq Dağıstan ilə birlikdə adı çəkilən mahalları kafirlərin işğalından tamamilə qurtarmaq ümidi ilə xüsusi məktubu acizanə şəkildə ərz və niyaz olunmaqla göndəririk ”* [3, s. 132 - 131].

Lakin onu da qeyd etmək lazımdır ki, bəhs etdiyimiz məktubda Osmanlı imperiyasının Rusiya ilə sülh münasibətlərində olduğu və Səlim xanın kömək istəyinin bu münasibətləri poza biləcəyi də vurğulanır və qeyd olunur ki; *“ ... lakin, Osmanlı dövləti ilə Rusiya arasında dinc əlaqələrin qurulduğu bir zamanda öz vəziyyətini çətinə salaraq bu münasibətləri gərginləşdirməyin imkan xaricində olduğunu bilirik ”* [3, s. 132 - 131].

Yeri gəlmişkən, Səlim xan bundan sonra Osmanlı sultanı ilə şəxsən görüşmək üçün Bağdaddan İstanbula yola düşmüşdü. Bunu onun yolüstü Ərzurumdan Osmanlı sultanına

*Qarabağ xanı ailəsi ilə birlikdə qətlə yetirilən zaman onun arvadı Şəki xanı Səlim xanın bacısı Tuti bəyim də öldürülmüşdü.

1819 – cu il iyunun 1 – də (hicri 5 şaban 1234) göndərdiyi məktubu da sübut edir. Səlim xan həmin məktubunda yazırdı: *" .... Bağdaddan sonra Ərzuruma daxil olub öz xidməti borcumu yerinə yetirirəm və ali yüksək dövlət xadiminə daim dua etməkdəyəm. Sizin əzəmətli şövkətinizə və əmrinizə əsasən yüksək vəzifəli qardaşınız və Bağdadın əmiri olan Davud paşa özünün yüksək vəzifəli şəxsləri ilə birlikdə məni yola saldılar. Şaban ayının ikisində Ərzuruma gəlib çıxmışam. Sizin nəzərinizə çatdırılacaq məsələləri yazılı surətdə çatdırmaq mümkün olmadığına görə onları şifahi surətdə şəxsən Sizin nəzərinizə çatdırmağı özümə borc bilirəm. Elə buna görə də məni qəbul etmənizi rica edirəm. Atalar məsəli var, deyirlər: Turandan İrana, İrandan Turana. Sizi şəxsən ziyarət etmək mənə xoş olar. Ümid edirəm ki, mənim xahişimi qəbul edəcək və məni yüksəklərə qaldıracaqsınız.*

*Şəki, Şirvan və Dağıstanın keçmiş valisi"*[16, s. 127].

Şəki xanlığının Osmanlı imperiyası ilə əlaqələrini araşdırmaq üçün Başbakanlıq Osmanlı Arxiv sənədləri içərisində mərhum Qarabağ xanı İbrahim xanın qızı – Şəki xanı Səlim xanın həyat yoldaşı Tuti bəyimin Osmanlı sultanına 1813 – cü il iyulun 5 – də (hicri 1227 – ci il) ərəbcə ünvanladığı məktubu da olduqca qiymətlidir. Belə ki, həmin məktubunda özünü " Qarabağın şəhid xanı İbrahim xanın qızı Tuti bəyim" kimi təqdim edən və Cənubi Qafqazdakı vəziyyəti təsvir edərək, ruslarla mübarizə apararaq, Şəkini geri qaytardıqları, işğalçıların zəifləməsindən istifadə edərək Dağıstanın müsəlman əhalisi ilə ittifaq bağladıqları və Osmanlı dövlətinin gərəkli yardımı göstərəcəyi təqdirdə üstünlük qazanacaqlarını bildirən Tuti bəyim yazırdı: *"... ruslar Tiflisi istila etdikdən sonra biz onlara qarşı dörd il mübarizə apardıq. Minlərlə müsəlman bacı və qardaşlarımız şəhid oldu və biz geri çəkildik. İndi əsgərlərimiz kafirlərlə (ruslarla) mübarizə aparıb, onları Şəkidən çıxarıb. İndi Şəki bizim nəzarətimizdədir. Amma biz onların geri qayıtmasından ehtiyat edirik, çünki bizim müdafiə olunmaq üçün yetərli silah – sursatımız yoxdur. Elə buna görə də vəziyyətimizi Sizə ərz edirəm. Bundan əlavə, biz Dağıstanın rəhbərləri və müsəlman xalqı ilə ittifaq qurmuşuq. Vəziyyətimiz haqqında Sizlərə məlumat verməsi üçün Hüseyn Əfəndini Osmanlı dövlətinə göndəririk. Dövlət rəhbərimizdən bizim adımıza bir fərman verməsini və onun əmrinin yerinə yetiriləcəyinə ümid edirik. Biz burada bütün silahlılarımızla birlikdə qırx minə yaxın müsəlmanıq. İndi ətrafdakı rus ordusu olduqca zəifləmişdir, onlar bizə qalib gəlməyə qadir deyil...* "[8, s. 155; 27, s. 186 - 188].

Lakin Şəki xanlığının Çar Rusiyasına qarşı Osmanlı imperiyasından yardım almaq planı baş tutmadı. Gülüstan müqaviləsi (1813) ilə Şimali Azərbaycanın böyük hissəsini, o cümlədən Şəki xanlığını işğal etmiş Rusiya imperiyasının Cənubi Qafqazdakı mövqeyi Türkmənçay müqaviləsindən (1828) sonra daha da möhkəmləndi: Şimali Azərbaycanın İrəvan və Naxçıvan xanlıqları da Rusiya imperiyasının tərkibinə qatıldı. Bütünlüklə Şimali Azərbaycanda olduğu kimi Şəki xanlığında da Rusiya işğal rejimi dövrü başlandı.

**MƏNBƏLƏR VƏ ƏDƏBİYYAT**


1. Arzu Əşrəf qızı. Car – Balakən camaatlığı. Bakı, 2009, 256 s.
2. Azərbaycan tarixi. 7 cilddə. III cild. Bakı, 1999, 584 s.







3. Bağdad valisi Davud paşanın məktubu, 1818. BOA, Hatt – i Hümayun, № 761/35955. //Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 səh.
4. Bakıxanov A. Gülüstani – İrəm, Bakı, 2001, 287 səh.
5. Çıldır valisi Süleyman paşanın Osmanlı sultanına məktubu, 1783 – 1784 . BOA, Hatt – i Hümayun, № 4/94 G. // Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı,2010, 508 səh; Osmanlı belgelerinde Karabağ. İstanbul, 2009, 660 s.
6. Çıldır valisi Süleyman paşanın Sədarətə məktubu, 1785. BOA, Hatt – i Hümayun, № 04/110. //Azərbaycan tarixi arxiv sənədlərində. XVIII - XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s.; Osmanlı belgelerinde Karabağ. İstanbul, 2009, 660 s.
7. Ədalət Tahirzadə. Şəki tarixi qaynaqlarda. Bakı, 2005, 256 s.
8. Qarabağın mərhum xanı İbrahim xanın qızı Tuti xanımdan Osmanlı dövlətinə məktub, 1813. BOA, Hatt – i Hümayun, № 1108/ 44645 F. //Azərbaycanın tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s. ; Osmanlı belgelerində Karabağ. İstanbul, 2009, 660 s.
9. Mahmud İsmayıl, Maya Bağırova Şəki xanlığı. Bakı, 1997, 76s.
10. Mahmudov Y.M. Şükürov K. K. Azərbaycan beynəlxalq münasibətlər və diplomatiya tarixi. 1639 – 1828. I cild. Bakı, 2009, 512 s.
11. Mahmudov Y.M. Azərbaycan tarixi. Erkən intibah dövrü. Bakı, 2008, 128 s.
12. Məmmədov H. M. Osmanlı imperiyasının xarici siyasətində Azərbaycan xanlıqları. Azərbaycan SSR Elmlər Akademiyası Xəbərləri. Tarix, fəlsəfə və hüquq seriyası, 1989, № 3, s. 44 – 50.
13. Mustafazadə T. T. XVIII yüzillik – XIX yüzilliyin əvvəllərində Osmanlı – Azərbaycan münasibətləri. Bakı, 2002, 372 s.
14. Nadir şah Əfşarla Şəki hakimi Hacı Çələbi arasında olan hadisələrə dair Osmanlı dövlətinə göndərilən Əhməd xan möhürü ilə məktub, 1746. Başbakanlıq Osmanlı Arxivi, Hatt – i Hümayun, № 7/231 // Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s.
15. Nəcəfli G.C. Azərbaycan xanlıqlarının Osmanlı dövləti ilə siyasi əlaqələri (XVIII əsrin II yarısı) Bakı, 2002, 132 s.
16. Sabiq Şəki xanı Səlim xan haqqında, 1819. BOA, Hatt – i Hümayun, № 823/37395 //Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s.
17. Şəki xanı Hacı Çələbinin Osmanlı dövlətinə məktubu, 1754. BOA, Hatt - i Hümayun, № 5/ 156. //Azərbaycan tarixi arxiv sənədlərində. XVIII – XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s.
18. Şəki xanı Məhəmmədhəsən xanın Osmanlı dövlətinə məktubu, 1784. BOA, Hatt – i Hümayun, № 4/94 L. //Azərbaycan tarixi arxiv sənədlərində. XVIII - XX əsrin əvvəlləri. I cild. Bakı, 2010, 508 s.; Osmanlı belgelerinde Karabağ. İstanbul, 2009, 660 s.
19. Şəki xanlığının tarixindən. Bakı, 1958.
20. Şirinbəy Hacıəli. Şimal – Qərbi Azərbaycan: İngiloylar. Bakı, 2007, 280 s.
21. Всеподданнейший рапорт кн. Цицианова от 22 – го мая 1805 года, № 19 //Кавказской Археографической Комиссии, т. 2, Тифлис, 1868, док. 1436, 1238 с.
22. Гарабаг: Кюрекчайский договор – 200. Баку, 2005, 176 с.
23. Левиатов В. Н. Очерки из истории Азербайджана в XVIII веке. Баку, 1948, 227 с.
24. Отношение кн. Цицианова к кн. Чарторыйскому, от 22 – го мая 1805 года, № 328 // Кавказской Археографической Комиссии, т. 2, Тифлис, 1868, док. 1437, 1238 с.
25. Отношение кн. Цицианова к барону Будбергу от 4 – го января 1807, № 1 //Акты Кавказской Археографической Комиссии, т.3, Тифлис, 1869, док. 492, 760 с.
26. Письмо гр. Гудовича к барону Будбергу, от 21 – го августа 1806 года, № 21 // Акты Кавказской Археографической Комиссии, т.3, Тифлис, 1869, док. 606, 760 с.
27. Osmanlı belgelerinde Karabağ. İstanbul, 2009, 660 s.
28. Osmanlı devleti ile Azerbaycan türk hanlıkları arasındakı münasibetlere dair arşiv belgeleri.(Karabağ – Şuşa, Nahçıvan, Bakü, Gence, Şirvan, Şeki, Revan, Kuba, Hoy) 1578 - 1914. I kitab. Ankara, 1992, 427 s.
29. İbrahim Yüksel. "Çarlık Rusiyasının Azerbaycanı istilası ve Osmanlı devletinin tutumu." Kafkas araştırmaları. İstanbul, 1988, s. 25 – 39.

**G. KH. Talibova**

## FROM THE HISTORY OF RELATIONS OF THE SHEKI KHANATE AND THE OTTOMAN EMPIRE

### SUMMARY

The article "From the history of relations of the Shaki khanate and the Ottoman Empire" deals with the relations of the Sheki khanate that had played an important role in preservation of north - western part of Azerbaijan with the Ottoman Empire. In the article starting from the time of Haji Chalabi khan the struggle of all Shaki khans against the aggressive policy of the Russian Empire is elucidated. In this struggle is given importance to the relations of Sheki khanate with the Ottoman Empire.

**Г. Х. Талыбова**

## ИЗ ИСТОРИИ СВЯЗЕЙ ШЕКИНСКОГО ХАНСТВА С ОСМАНСКОЙ ИМПЕРИЕЙ

### РЕЗЮМЕ

В статье исследуются взаимоотношения Шекинского ханства с Османской империей, сыгравшие значительную роль в обеспечении безопасности северо – западных регионов Азербайджана. Кроме того, в статье освещается борьба шекинских ханов, начиная с Гаджи Челеби хана, против завоевательной политики Российской империи. В контексте этой борьбы в статье широкое место уделяется связям Шекинского ханства с Османской империй.

**Məqalə AMEA A.A.Bakıxanov adına Tarix İnstitutu Elmi Şurasının 2011-ci il 19 yanvar tarixli iclasının 2 saylı qərarı və t.ü.f.d. Ə.F.Ələkbərovun və t.ü.f.d. F.K.Əliyevanın müsbət rəyləri əsasında çap olunur.**